# Mündəricat

# MÜQƏDDİMƏ

Həmd elm öyrənməyi və bu elmi yazılara tökməyi nəsib edən Allaha məxsusdur. Salət və Salam Onun Rəsulunun, Ailəsinin, Əshabının və qiyamətə qədər onun yolundan gedənlərin üzərinə olsun. Bundan sonra:

**Muaz ibn Cəbəl** rəvayət edir: Heç şübhəsiz elm bir nurdur. Allah üçün elm təhsil etmək ibadətdir. Elmi axtarmaq cihaddır. Bilməyənə öyrətmək sədəqədir. Elmi müzakirə etmək zikirdir. Allah ancaq elm ilə bilinər və Allaha ancaq elm ilə ibadət edilər. Allah, qövmləri elmlə ucaldar və digər insanlara üstün edər.

Millətlər ancaq elmlə doğru yolu tapa bilərlər.[1]

**Sufyan ibn Uyeynə** rəvayət edir: Allah qatında mərtəbəsi ən yüksək olanlar, Allah ilə qulları arasında yer alan kimsələrdir ki, onlar da Nəbilər və Alimlərdir.[2]

**Cəfər ibn Məhəmməd** rəvayət edir: İblisə fəqihin ölümündən daha çox sevimli gələn heç bir şey yoxdur.[3]

**Said ibn Cabir** rəvayət edir: İnsanların həlakının əlaməti isə heç şübhəsiz fəqihlərin ölməsidir.[4]

---

[1] İbni Əbdulbərr bu sözü daha uzun bir şəkildə Muaz ibn Cəbəldən mərfu olaraq rəvayət etmişdir. Ancaq sənədi zəifdir.

[2] Xatib əl-Bağdadi, əl-Fəqih və-l-Mutəfəqqih, c. 1, səh. 71. Sufyan bin Uyeynədən rəvayət etmişdir.

[3] İbni Əbdulbərr, Cəfər ibn Məhəmməddən rəvayət etmişdir. Cəmiu Bəyənu-l İlm c. 1, səh. 76.

[4] Xatib əl-Bağdadi, Said bin Cabirdən rəvayət etmişdir. Əl-Fəqih və-l Mutəfəqqih c. 1, səh. 37.

Yaşadığımız bu zamanda Müsəlmanların ən böyük problemlərindən biri də səhih olan elmdən fərsəx-fərsəx uzaq qalmalarıdır. Bu ümmətin başı nə şəkildə düzəlmişsə sonuda heç şübhəsiz, o şəkildə düzələcəkdir. Bu ümmətin başının düzəlməsi isə elmlə olmuşdur. Allah Rəsulu (səllallahu aleyhi və səlləm) Allahın ona vəhy etdiyi bu elmi əshabına təbliğ etmiş, əshabı isə bu elmi Allah Rəsulundan aldıqları kimi tədris və həyatlarına tətbiq etmişlər. Bu şəkildə çox qısa zamanda Seyyid Qutubun ifadəsi ilə o bənzərsiz Quran nəsli ortaya çıxmışdır.

Tarixin səhifələrinə baxdığımız zaman İslam ümmətinin elmə nə qədər əhəmiyyət verdiyi aşikardır. Sadəcə tək bir hədis öyrənmək üçün günlərcə qət edilən yollar, elm uğruna dünyəvi hər cür

ləzzətdən üz döndərmələri, tək bir mövzu haqqında cildlərlə əsərlər yazmaları və burada saymaqla bitirə bilməyəcəyimiz daha neçə örnəklər İslam ümmətinin elmə verdiyi əhəmiyyətin göstəricisidir.

Nəticə olaraq bu gün İslam ümmətinin üzərində duran bəlalardan qurtulması ancaq elmlə, elm üzərə əməl və təbliğ ilə mümkündür. Bu səbəblə İslam ümməti üzərinə düşəni etməklə mükəlləfdir və bu vəzifə müsəlmanlara ayni olaraq fərzdir. Ümmətin hər bir fərdi elmi diriliş üçün çalışmalıdır. Bunun üçün isə ilk olaraq, hər bir müsəlman öz nəfsində olan əksikləri düzəltməklə işə başlamalıdır.

Ümmətin elmlə dirilməsi fərdlərin tək başına elmi tədris etmələri ilə mümkün deyildir. Bunun üçün toplu şəkildə fəaliyyətə başlamaq lazımdır. Ümmət içində elmli olanlar yeni fərdlər

yetişdirməyə başlamalıdırlar. Yeni yetişəcək nəsil üçün Quran elmlərini öyrədən məkanlar qurulmalı və bu məkanların bütün ehtiyacları ümmətin fərdləri tərəfindən qarşılanmalıdır.

Uca Allahdan qələmə aldığım bu kitabın qiyamət günü lehimdə xeyir üzərə yazılmasını və insanlara fayda verməsini diləyirəm!

*Məhəmməd Hüseynbəyli*
*18 Şaban 1440 (23 aprel 2019)*

## Dində məcburiyət yoxdur ayəsini necə anlamalıyıq?

Uca Rəbbimiz Bəqərə surəsində buyurur:

Dində məcburiyyət yoxdur. Artıq doğru yol azğınlıqdan aydın fərqlənir. Hər kəs tağutu inkar edib Allaha iman gətirərsə, heç vaxt qırılmayan ən möhkəm dəstəkdən yapışmış olar. Allah Eşidəndir, Biləndir.[5]

Ayənin əvvəlində Allahu Təalə dində məcburiyyət yoxdur deyərək insanların zorlama, təhdit, qol gücü ilə dinə çağırılmasını qadağan edir. Çünki Allahu Təalə heç bir qulundan məcburi əməli din olaraq qəbul etmir. Buna görə İslam sevgisi insanların qəlbində yer etməlidir.

[5] Bəqərə surəsi, 256

İslam dəvətçiləri də bunu bərpa etmək üçün çalışmalıdırlar. Ancaq təəssüflər olsun ki, cəmiyyətimizdə bu ayənin insanlara vermək istədiyi mesaj doğru anlaşılmayıb. İnsanlar Allahın əmrlərini tərk etmək və qadağanlarını etmək yönündən sərbəst olacaqlarını zənnedirlər. Məsələn, dində məcburiyyət olmadığı üçün namaz qılmaq, oruc tutmaq, zəkat vermək, həcc etmək və başqa əmr olunmuş əməlləri etmək insanlar üçün fərz deyil. Eyni ilə, dində məcburiyyət olmadığı üçün insanlara zina etmək, qumar oynamaq, tərbiyəsizlik etmək sərbəstdir. Ayə hal hazırda olduğu mənasından təhrif edilərək insanlara bu şəkildə təbliğ olunmuşdur. Halbuki ayənin əvvəli ilə

sonraki qisimlərini birbirindən ayırmadan olduğu kimi oxusaq ayənin zahir mənası belə bunun doğru olmadığı bildirir. Ancaq kor və bəsirətdən uzaq olan qəlb təbii ki, Allahın ayələrini öz nəfsi ilə anlamaq istəyir. Allahu Təalə açıq ifadələr ilə haq və batilin artıq aydın olduğunu və haq ilə batili seçmədə insanların məcbur edilməmələrini söyləyir. Yəni hər kəs öz seçimində sərbəstdir. İstəyən haq yolu istəyən isə batil yolu seçəbilər. Ayənin dəvam edən hissəsində isə haq yolunun Allaha iman edib Allahdan başqa ibadət olunan saxta ilahların rəd edilməsi ilə olacağını bildirir. Bunu edən insanların isə qopması bilməyən sağlam qulpa yapışaraq mükafatlandırılacaqları

bildirilir. Gördüyümüz kimi ayə insanlara sərbəstlik verir amma haq və batili seçməkdə. Ancaq insan haqqı seçib İslam yoluna daxil olarsa artıq Allahın əmir və qadağaları onun üçün həyatının yaşam yönünü verməlidir. Həyatını Allahın əmrlərini etmək və qadağanlarından çəkinməklə keçirməlidir. Bunun mükafatı isə Allah qatındadır.

## İslam nədir? İslamın bir qismini tərk edənin hökmü nədir?

İslam təslim olmaq deməkdir. Şəri mənada Allahın hökmlərinə təslim olmaq deməkdir. Təbiki bu tərif ümumi bir tərifdir. Bu haqda tərifləri çoxaltmaq mümkündür. İslam həmdə yaşanacaq həyat nizamıdır, bir düsturdur. İslam sadəcə kəlimələr ilə ifadə olunmaz. İslam qulun Rəbbinin əmirlərinə tabe olması barədə söz verməsidir. Buna görə də İslam dininin mənsublarına müsəlman vəya mömin ismi verilmişdir.

Uca Rəbbimiz buyurur:

Ey iman gətirənlər! İslamı bütövlüklə qəbul edin və şeytanın addım izləri ilə getməyin. Şübhəsiz ki, o sizə açıq-aydın düşməndir.[6]

Həqiqətən, Allah yanında qəbul olunan din, İslamdır! Kitab verilənlər ancaq özlərinə elm gəldikdən sonra aralarındakı zülm və həsəd üzündən ixtilafa düşdülər. Kim Allahın ayələrini inkar edərsə, bilsin ki, Allah tez haqq-hesab çəkəndir.[7]

İslamdan başqa bir din axtaran şəxsdən, o din heç vaxt qəbul olunmaz və o, axirətdə ziyana uğrayanlardan olar.[8]

---

[6] Bəqərə surəsi, 208
[7] Ali İmran surəsi, 19
[8] Ali İmran surəsi, 85

Sualın digər qisminə gəldikdə isə, bir fərdə hökm vermək çətin işdir. Bunu hər insan etmək mükəlləfiyyətində deyildir. Eyni ilə sizdə belə bir mükəlləfiyyətdə deyilsiniz. Odur ki, özünüzü belə çətin məsələlər ilə məşğul etməyin.

İmam Ğazzali deyir:

Küfr hökmü, köləlik və azadlıq kimi şəri bir hökmdür. Mənası, qanının mübah sayılması və əbədi olaraq atəşə girməsinə hökmedilməsidir. Bu cəhətdən bilinməsi şəriətlədir. Buna görə ya nass ilə bilinər ya da haqqında olan nassa qiyas etməklə bilinər.[9]

[9] Fəslu’t Təfriqati Beynə’l İsləmi və’z Zəndiqati 128

Hər halda bu suala doğru cavab isə geniş sual ilə mümkündür. Verdiyiniz sual ümumidir. Olabilər bir insan İslamın sadəcə bir məsələsinə görə kafir olsun olabilər olmasın. Bu sualı cavablandırmaq üçün müəyyən bir məsələ üzərinə danışılmalıdır.

## Təkfir Mövzusuna necə yanaşmalıyıq?

Xütbələrimdə, dərslərimdə dəfələrlə təkfir mövzusunun təhlükəsindən danışmışam. Təkfir avam üçün öyrənib tətbiq ediləcək bir mövzu deyildir. Avamın təkfir məsələsini öyrənib tətbiq etməyə çalışmağı, uşağın partlayıcı ilə oynamasına bənzəyir. Çünki bu mövzu insanın həm özünə həmdə ətrafına zərər verir. Təkfir, İslamda geniş ələ alınan və incələnən mövzulardandır. Bu səbəblədir ki, hələ tam olaraq dəstəmaz və namaz kimi hər kəsin mükəlləf olduğu mövzulardan cahil olanlar bu mövzu haqqında danışmağa haq sahibi deyillərdir. Təkfirin təhlükəsi ilə bağlı bəzi hədisləri zikretmək yerinə düşərdi.

İbn Ömər radiyallâhu anhu dedi ki: Rasûlullah sallallâhu aleyhi ve səlləm buyurur: “Bir nəfər qardaşına: Ey kâfir deyəcək olarsa, o söz ikisindən birinə qayıdar. Əgər onun dediyi kimidirsə məsələ yoxdur, deyilsə o söz onu söyləyənə geri qayıdar.[10]

Əbû Zərr əl-Qıfəri radiyallâhu anh’dən rəvâyətə görə o Rasûlullah sallallâhu aleyhi və səlləm’i belə buyurarkən eşitmişdir: “Bir kimsə digərinə: Kâfir deyə səslənər vəya ona: Ey Allah’ın düşmanı deyərsə o da belə deyilsə, o söz onu söyləyənə geri qayıdar.[11]

Bu iki hədis mövzunun təhlükəsini bildirmək üçün kifayətdir.

[10] Müslim 111
[11] Müslim 112

## Dəvət zamanı nələrə diqqət etməliyik?

Dəvət zamanı diqqət edilməsi lazım olan mövzular əslində çoxdur. Hətda bu mövzu barədə müstəqil kitab yazmaq da mümkündür. Dəvət mövzusu geniş bir mövzu olduğu üçün, bu mövzunu əhatə edən bir bəhs də eyni ilə geniş olur. Mövzuya keçmədən öncə məsələnin əhəmiyyətinə vurğu etmək istərdim. Allahu Təalə Ali İmran surəsində buyurur:

Siz insanlar arasında üzə çıxarılmış ən xeyirli ümmətsiniz. Siz marufa uyğun yaxşı işlər görməyi əmr edir, pis əməlləri qadağan edir və Allaha iman gətirirsiniz.[12]

[12] Ali İmran 110

İslam ümmətinin insanlar içərisində üzə çıxarılmış ən xeyirli ümmət olmasının səbəbi yaxşılığı əmr edib, pisliklərdən isə çəkindirməkdir. İnsanları Allahın dininə dəvət etmək çox şərəfli və Allah qatında dəyəri üstün olan bir əməldir. Ancaq hər şeydən öncə insanları Allahın dininə dəvət edənlər, əməl edən və insanlara nümunə şəxsiyətlər olmalıdır. Düşünün birisi insanlara nafilə namazlar qılmağı tövsiyə edir ancaq özü nafilə namazlar qılmır. Bu insanın sözünün nə kimi dəyəri olabilər? Eyni ilə digər məsələləridə buna misal vermək olar. Ona görə dəvətçilər hər şeydən öncə əməl edən dinlərini layiqincə yaşamağa çalışan insanlar olmalıdır. Belə olduğu təqdirdə dəvət də Allahın izni ilə

bərəkətli olacaqdır. İndi isə keçək dəvətçinin diqqət etməsi lazım olan məsələlərə. Öncəliklə vurğulamaq istədiyim budur ki, bu məsələlər çoxdur ancaq mən ikisinə toxunmaq istəyirəm. Buda hikmət və gözəl öyüd nəsihətdir. Allahu Təalə Nəhl surəsində buyurur:

(Ya Rəsulum!) İnsanları hikmətlə (Qur´anla, tutarlı dəlillərlə), gözəl öyüd-nəsihət (moizə) ilə Rəbbinin yoluna (islama) də´vət et, onlarla ən gözəl surətdə (şirin dillə, mehribanlıqla, əqli səviyyələrinə müvafiq şəkildə) mübahisə et. Həqiqətən, Rəbbin yolundan azanları da, doğru yolda olanları da daha yaxşı tanıyır![13]

[13] Nəhl surəsi, 125

Allahu Təalə ayədə bizlərə hikmət və gözəl öyüd nəsihət haqqında xəbər verir. Bəs nədir hikmət? Dəvət zamanı hansı əməllər ilə hikmətli olabilərik?

1. Dəvət zamanı hikmətli olmaq üçün insan öncə hansı vaqiədə hansı mövzunu danışacağını bilməlidir. Xristiyanlara dəvət zamanı dəvətçinin içkinin haramlığından danışması yersiz olar. Çünki həmən yerdə olanlar içkinin haramlığına inanıb bir daha içki içməsələr belə bunun axirət həyatı üçün onlara bir faydası olmaz. Buna əsasən öncəliklə mövzu doğru seçilməlidir. Doğru mövzu seçilmədiyi müddətçə aparılan iş sadəcə zaman israfına səbəb olar.

2. Dəvət zamanı danışılan məsələlər dəlilləri ilə danışılmalıdır. Əgər dəvət zamanı dəvətci dediyi sözləri bir mənbəyə isnad edə bilmirsə buda dəvətçi üçün ciddi problemlərə səbəb olabilər. İsnad şərtdir. Çünki dinimiz isnad dinidir. Hər şeyin mütləq bir isnadı olmalıdır. Dəvətçi də isnad məsələsində hazırlıqlı olmalıdır. Əsasəndə muxalifləri qarşısına çıxarkən Haqqı insanlara isbat etmək üçün çalışarkən isnadda edəcəyi xətalar batil firqənin insanlar nəzərində haq kimi görsənməsinə səbəb olabilər. İsnad məsələsinin əhəmiyyətlə vurğulanması buna görədir.

3. Hikmətlə bağlı digər bir məsələ isə harda sərt harda yumşaq olunmalıdır bunun doğru təyin edilməsi lazımdır.

Əgər dəvətçi dininin, Rəbbinin, Peyğəmbərinin təhqir olunduğu yerlərdə yumşaq olsa, öz nəfsinin təhqir edildiyi yerdə isə insanlara qarşı sərt olsa bu yumşaq olma və sərt olma məsələsini doğru təyin etməmiş olar. Buda dəvətci üçün ciddi xətalardan və hikmətsiz davranışdan başqa bir şey deyildir.

Umumi olaraq bir daha nəzər yetirsək görərik ki, hikmət dəvət zamanı əhəmiyətlidir. Əgər insan dəvət zamanı hikmətli olabilməsə bir fayda əldə edəbilməz.

Bir başqa mövzu isə səbirlə, gözəl öyüd nəsihət ilə qarşılıq verməkdir. Buda əsas məsələrdən biridir. Əgər insan ona çox sual verildiyi zaman və ya etiraz edilyi zaman səbr edəbilməsə qarşısındakini

acılamağa və ona qarşı sərt olmağa başlasa yenə də dəvətdə fayda əldə edəbilməz. Dəvət işini aparan birisi mütləq səbir sahibi və yumşaq rəftar etməyi bacaran birisi olmalıdır. Nəticə etibarı ilə dəvət zamanı mütləq olaraq hikmətli, səbirli və yumşaq rəftarlı olmağı bacarmaq lazımdır. Bu zaman fayda əldə edilmiş olar.

## Dəvət işi ilə kimlər məşğul olmaldır?

Dəvət işi sadəcə bir insanın bacaracağı bir iş deyildir. Dəvətin verimli olması üçün bu işin bir kollektiv çalışması olması şərtdir. Çünki dəvət çalışmaları sərhədlənməyəcək qədər genişdir. Hər işə bir insanın yetişməsi mümkün olmadığı üçün çalışqan tələbələrə və birdə onlara islamı elmləri öyrədən və dəvət işini yüklənən müəllimlərə ehtiyac vardır. Təbiki bu mövzu əslində geniş bir mövzudur. Bu işə girən insanların çalışmalarından əlavə Allaha bağlılıqları tam olmalıdır. Çünki bir işin bərəkətlənməsi, o işi görənlərin Allaha olan ibadətlərində ixlaslı olmalarına bağlıdır. Əgər bu olmazsa nə qədər fəal

olsalar belə bunun Allah qatında dəyəri olmaz. Ona görə öncəlik ixlasa verilməli və sonra Allah üçün çalışmalara başlanmalıdır. Necə ki Allahu Təalə Ali İmran surəsində buyurur:

(Ey müsəlmanlar!) İçərinizdə (insanları) yaxşılığa çağıran, xeyirli işlər görməyi əmr edən və pis əməlləri qadağan edən bir camaat olsun! Bunlar (bu camaat), həqiqətən nicat tapmış şəxslərdir.[14] Allahu Təalə bu işləri görən bir camaatın olmasını vurğulayır.

[14] Ali İmran surəsi, 104

Bu ayə ilə birlikdə dəvət işinin fərzi kifayə olduğu bilinir. Yəni bir qrup insanın bu işi yüklənməsi ilə digər insanlardan bu məhsuliyət düşəcəkdir. Bu çalışmalar da elm və ixlas üzərinə qurulu olmalıdır.

## Hər günah üçün tövbə edilərmi?

Bəli, hər günah üçün tövbə etmək lazımdır. Amma burada daha əhəmiyyətli olan tövbəni şərtlərinə uyğun etməkdir. Tövbənin şərtlərini bu şəkildə sıralamaq olar.

1. Peşman Olmaq

Uca Allah buyurur:

Allah ancaq o kəslərin tövbələrini qəbul edir ki, onlar avamlıqları üzündən pis iş gördükdən sonra tezliklə tövbə edirlər. Allah onların tövbələrini qəbul edər. Həqiqətən, Allah Biləndir, Müdrikdir.[15]

İmam Sabuni ayəni təfsir edərkən deyir: Allahın qəbul edəcəm deyə söz

[15] Nisa surəsi, 17

verdiyi tövbə, bilmədən bir günah edib bunun çirkinliyini və nəticəsini anladıqdan sonra peşman olan və ölmədən tövbə edənlərin tövbəsidir. Allah, yaratdığını yaxşı biləndir və qoyduğu qanunlarda hikmət vardır.[16]

Ayədə uca Rəbbimiz xətasından peşman olaraq tövbə edənlərin tövbəsinin qəbul olunacağını bildirir. Bu ayə tövbə edərkən insanın etdiyi xətaya görə peşman olmasını şərt qoşur. Əgər bir insan etdiyi xətadan peşman olmadan adət üzərə tövbə edərsə, tövbəsi keçərli olmaz.

[16] Safvətut Təfəsir, Nisa surəsinin təfsiri

2. Bir daha eyni günaha qayıtmamaq

Ənəs bin Məlik radiyallahu anhu Allah Rəsulu sallallahu aleyhi və səlləmin belə dediyini rəvayət edir:
Üç xislət vardır ki, bunlar kimdə olarsa imanın şirinliyini dadmış olar. Allah və Rəsulunu hər şeydən və hər kəsdən daha çox sevmək, bir qulu sadəcə Allah üçün sevmək, Allah, İslamı nəsib etdikdən sonra təkrar küfrə düşməkdən, atəşə atılmaqdan qorxduğu kimi qorxmaq.[17]

İmam Nəvəvi deyir: Bu hədis əzəmətli bir hədisdir. İslamın əsillərindən bir əsldir. Alimlər bu hədis haqqında deyir: İman şirinliyinin mənası: İtaətlərdən ləzzət almaq, məşəqqətləri yüklənərək Allah və Rəsulunun rızasını qazanmaq,

[17] Muslim, 43

bunu yer üzündə olanlara dəyişmək və Allaha itaət edib, itaətinə muxalif olan işləri tərk edərkən, qulun Rəbbinə və Rəsuluna olan məhəbbətidir.[18]

Son olaraq bir məsələ üzərinə nəsihət etmək istərdim. Tövbə edərkən tələsmək lazımdır. İnsanın bu dünyadaki yaşamının nə zaman sona çatacağı, ölümün nə zaman gələcəyi bəlli olmaz. Şeytan daim insanları tövbə etməkdə geçikdirməyə, zamanından oğurlamağa çalışar. Bu səbəblə tövbələri tezləşdirmək lazımdır. Uca Rəbbimiz bu barədə buyurur:

Ey insanlar! Rəbbinizdən qorxun. Valideynin övlada, övladın da valideynə

[18] İmam Nəvəvi, Muslim şərhi

heç bir fayda verə bilməyəcəyi gündən çəkinin. Həqiqətən, Allahın vədi bir həqiqətdir. Qoy bu fani dünya sizi çaşdırmasın, hiyləgər şeytan da sizi Allahın əzabından arxayınlaşdırıb tovlamasın.[19]

Uca Rəbbim tövbələrinizi qəbul etsin və sizi tövbəsi üzərinə sabit olanlardan etsin!

[19] Löğman surəsi, 33

## İxlas nədir? Bu haqda geniş izah verəbilərsinizmi?

İxlas, dinin həqiqəti və Allahu Təalənin da ifadə etdiyi kimi peyğəmbərlərin dəvətinin açarıdır:

Halbuki onlara əmr edilmişdir ki, Allaha – dini yalnız Ona məxsus edərək, batildən haqqa (islama) dönərək – ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur![20]

Bil ki, xalis din (sırf ibadət, təmiz itaət) ancaq Allaha məxsusdur.[21]

İxlas, ibadətlərin özü və ruhudur. **İbn Hazm** belə dedi: "Niyyət qulluğun sirlərindəndir. Bədən üçün ruh nədirsə,

[20] Bəyyinə surəsi, 5

[21] Zümər surəsi, 3

ibadət üçündə niyət odur. Qulluqda, ruhsuz bir iş düşünülməz. Çünki niyətsiz bir iş, ruhsuz bir bədənə bənzəyər. Ruhsuz bir bədən də xarab olmuş deməkdir."

İxlas, əməllərin qəbul edilməsi vəya rəddedilməsi üçün bir təməl təşkil etməkdədir. Əməllərin uğura çatması və ya ziyana uğraması ixlasa bağlıdır. İnsanın ixlas sahibi olmaması, onu cəhənnəmə aparar. İxlas isə cənnətə aparar.[22]

[22] İxlas haqda xüsusi kitab yazdığım üçün burada cavabı qısa tutdum.

## Namazda təkbir gətirərkən əlləri qaldırmağın hökmü nədir?

Abdullah bin Ömər deyir: Rasulullah namaza başlarkən əllərini çiyinlərinə qədər qaldırardı. Rukuya getmək üçün təkbir aldığında və başını rukudan qaldırdığında əllərini qaldırar və belə deyərdi: Allah ona həmd edəni eşitdi. Rəbbimiz bütün həmdlər sənədir. Səcdə edərkən bunu etməzdi.[23]

Əbu Davudda keçən Əbu Humeyd hədisində belə bir ifadə vardır: Əllərini çiyinlərinə qədər qaldırar sonra təkbir gətirərdi.

Müslimin Malik bin Huveyrisdən nəql etdiyi bir rəvayətdə İbni Ömər hədisinə

[23] Buxari, Müslim, Əbu Davud

bənzəməklə bərabər orada bu cümləyə yer verilmişdir: Əllərini qulaqlarının üst qisminə qədər qaldırardı.

***Hədislərdən çıxarılan hökmlər:***

1 – İbni Ömər hədisi namaza başlayarkən əllərin qaldırılmasının sünnət olduğunu göstərməkdədir. Bu mövzuda icma vardır.

2 – Hədis həmçinin rukuya gedərkən və rukudan qalxarkən əllərin qaldırılmasının sünnət olduğuna dəlil olaraq göstərilmişdir. Rukuya gedərkən və rukudan qalxarkən əllərin qaldırılması ilə əlaqəli olaraq dəlil gətirilən hədislərin səhih olması hətda təvatür dərəcəsinə çatmasına görə Şafilər, Hənbəlilər və alimlərin çoxu bu görüş üzərində olmuşlardır. Buxari

hədisi nəql edən on yeddi səhabənin adını zikr etmişdir. Bir başqa görüşə görə əlləri qaldırma mövzusu əlliyə qədər səhabənin hədisində keçməkdədir. İçlərindən onu cənnətlə müjdələnmiş səhabələrdir.[24]
Şafilər buna əlavə olaraq daha öncə keçən Tirmizinin rəvayət etdiyi Əbu Humeyd əs Saidi hədisində və digər hədislərdə zikr edildiyi üçün üçüncü rükətə qalxarkən də əllərin qaldırılacağını söyləmişlərdir.

Hənəfilərə və bir grup alimə görə - Malikilərin məşhur görüşüdə budur-iftitah təkbiri xaricində əlləri qaldırmaq sünnət deyildir. Onların bu mövzuda dəlilləri isə İbni Məsudun bu hədisidir:

[24] Fəthul bəri 2/149, Tarhut təsrib 2/264, Nazmul mutənəsir 58-59

Diqqət edin sizə Rasulullah (s.a.s) qıldığı kimi namaz qıldıracam. Namazı qıldırdı və iftitah təkbiri xaric əllərini heç qaldırmadı.[25] Hənəfilər və onlarla eyni görüşdə olanlar sahabədən nəqledilən digər bəzi hədis və əsərləri də dəlil gətirmişlərdir.

Nəticə olaraq bu mövzu ixtilaflı bir mövzudur. İnsanlara düşən məzhəblərinin görüşü ilə əməl etməkdir. Nəticə etibarı ilə hər məzhəbin əməlinin dəlili səhih hədislərlə mövcuddur. Buna görədə bu mövzularda mübahisə etməyə ehtiyac yoxdur. İxtilaflı mövzularda ixtilafın ədəbinə tabe olunmalıdır. Həmçinin burada bir məsələni də qeyd

[25] Əbu Davud 1/199, Tirmizi 2/40, Nəsai 2/182, Tirmizi hədisi həsən digərləri isə səhih saymışlardır.

etməkdə fayda vardır. Cahil insanların, heç bir şəriət təhsili olmayan insanların belə mövzulara girməsi doğru deyildir. Məzhəblər insanlara rahatlıq olsun deyə vardır. İnsanlar məzhəblərə tabe olmaqla özlərini ağır bir yükdən və ictihadı mövzulara girərək haram etməkdən qurtarmışlardır. Keçmiş alimlərimizdə məzhəblərə tabe olmuş və məzhəb görüşləri üzərinə kitablar yazmışlardır. Bu baxımdan təhsili olmayan insanların hədislərə baxaraq heç bir üsula dayanmadan hökm çıxarması caiz deyildir. Buna görədə bu işləri təhsilli insanların öhdəliyinə vermək lazımdır. Burada bir məsələni daha vurğulamaq istəyirəm. Təhsilli insanlarında bugün öz başlarına ictihadlar etməsi doğru

deyildir. Onların vəzifəsi Allahın dinini insanlara düzgün və ən asan yolla çatdırmaqdır. Ayələrə və hədislərə müraciət etməklə birlikdə fəqihlərində görüşlərinə diqqət yetirməli və insanlara mövzuları alimlərin anlatdığı üsul ilə anlatmalıdırlar. Bu üslubla islamı çalışmalar dəvam etdirildiyi müddətcə həm öyrədən həmdə öyrənən hər kəs nəsibini alacaqdır.

## Quran oxumadan öncə Allaha sığınmağın hökmü nədir?

Quran oxumadan öncə Allaha sığınmağın hökmü müstəhəbdir. Uca Rəbbimiz Nəhl surəsində belə buyurur:

Quran oxuduqda qovulmuş şeytandan Allaha sığın![26]

Gördüyünüz kimi uca Rəbbimiz biz qullarına Quran oxumadan öncə Ona sığınmağımızı əmr edir. Ancaq buradaki əmir formasında gələn cümlə bu əməlin vacib olduğunu bildirmir. Alimlərin çoxuna görə bu əməl müstəhəb olaraq qəbul edilmişdir.[27] İbni Cərir ət Təbəri belə deyir:

[26] Nəhl surəsi, 98

[27] İbni Cərir ət-Təbəri, 14/357

Allah Təalə Nəbisinə xitab edərək deyir: Ey Muhamməd, Quran oxuduğun zaman qovulmuş şeytanın şərrindən Allaha sığın.[28]

Eyni ilə ibn Kəsir ayə haqqında deyir:

Cümhurun yanında məşhur olan Quran tilavətindən öncə edilən istiazə[29] şeytanın vəsvəsələrini dəf etmək üçündür. Onların yanında ayətdən anlaşılan məna budur.[30]

Bu səbəblərdən öyrənmiş oluruq ki, Quran tilavətindən öncə Allaha sığınmaq lazımdır. Edəcəyimiz bu əməl vasitəsi ilə şeytanın vəsvəsələrindən qurtulacağıq. Qəlbimiz oxuduğumuz ayələrdən faydalanacaq. Nəhl surəsində keçən bu

---

[28] İbni Cərir ət-Təbəri, 14/357

[29] Sığınmaq

[30] İbni Kəsir təfsiri, 1/113

ayənin dəvamında[31] Allah Təalə bizlərə şeytanın iman edən və Allaha təvəkkül edən qulları üzərində heç bir hökmünün olmadığını vurğulayır. Bu ayədən anlaşılır ki, Quran tilavətindən öncə Allaha sığınmaq, Ona təvəkkül etməkdir. Bu halda artıq şeytanın insan üzərində heç bir hökmü qalmayacaq. Yəni şeytan vəsvəsələr ilə insanları faydadan uzaqlaşdıra bilməyəcək.

[31] Nəhl surəsi, 98

## Yaxşılığı əmr etmək və pisliklərdən çəkindirməyin mahiyəti nədir?

Allah azzə və cəllə buyurmuşdur:
Siz insanlar üçün çıxarılmış ən xeyirli ümmətsiniz. Yaxşılığı əmr edər, pisliklərdən də çəkindirərsiniz və Allaha iman edərsiniz.[32]

1. Yaxşılığı əmretmək və pisliklərdən çəkindirmək, İslamın ən böyük təməllərindən biridir. Şübhə yoxdur ki, qulların dünya və axirətdə qurtuluşu Allahın (azzə və cəllə) əmr etdiyi şəkildə ibadət etməyə və Rəsuluna itaət etməyə bağlıdır. Allaha qarşı edilən itaətlərin bütünü yaxşılığı əmretmək və pisliklərdən çəkindirməyə bağlıdır. Bu

[32] Ali İmran surəsi, 10

xüsusiyyəti ilə İslam ümməti insanlar üçün çıxarılmış ən xeyirli ümmət olma vəsfini qazanmışdır.
Qurani Kərim və Sünnəti Nəbəvi bu işin əhəmiyyətini açıq bir şəkildə bildirmiş, bununla möminlər arasında dostluq əlaqələri gerçəkləşmişdir.

Allah (azzə və cəllə) buyurmuşdur: Kişi və qadın bütün möminlər birbirlərinin dostu və vəliləridirlər. Yaxşılığı əmr edər və pisliklərdən çəkindirərlər. Namazı qılar, zəkatı verər, Allaha və Rəsuluna itaət edərlər. Bunları Allah rəhmət edəcəkdir. Çünki Allah Əzizdir, Hökm sahibidir.[33]

2. Yaxşılığı əmr etmək və pisliklərdən çəkindirmək düşmanlara qarşı Allahın

[33] Tövbə surəsi, 71

köməyinə və yerüzündə güc və hakimiyyət əldə etməyə səbəb olur.

Onlar ancaq “Rəbbimiz Allahdır”– dediklərinə görə haqsız yerə yurdlarından çıxarıldılar. Əgər Allah insanların bəzilərini, digərləri ilə dəf etməsəydi, içərisində Allahın adı çox zikr olunan monastırlar, kilsələr, sinaqoqlar və məscidlər dağılıb gedərdi. Allah Ona yardım edənlərə, mütləq yardım edər. Şübhəsiz ki, Allah Qüvvətlidir, Qüdrətlidir. Əgər onlara yer üzündə hökmranlıq versək, onlar namaz qılar, zəkat verər, yaxşı işlər görməyi əmr edib, pis işlər görməyi qadağan edərlər. Bütün işlərin aqibəti Allaha aiddir.[34]

[34] Həcc surəsi, 40-41

3. Yaxşılığı əmr etmək və pisliklərdən çəkindirmək qullar üzərində əzabın uzaqlaşdırılmağına səbəb olar. Allah (azzə və cəllə) buyurmuşdur:

İsrail oğullarından kafir olanlar həm Davudun, həm də Məryəm oğlu İsanın dili ilə lənətləndilər. Bu, onların asi olduqlarına və (Allahın qoyduğu) hədləri aşdıqlarına görə idi. Onlar bir-birlərini etdikləri pis əməllərdən çəkindirmirdilər. Onların etdikləri necə də pisdir![35]

4. Yaxşılığı əmretmək və pisliklərdən çəkindirmək, nəfsini qurtarmaq istəyən kimsələrin etməsi lazım olan ən əhəmiyyətli əməllərdəndir.

O zaman onlardan bir dəstə dedi: "Allahın məhv edəcəyi və ya şiddətli

[35] Maidə surəsi, 78-79

əzaba düçar edəcəyi bir tayfaya nə üçün öyüd-nəsihət verirsiniz?” Onlar dedilər: “(Bu,) Rəbbiniz yanında üzrxahlıq etmək üçündür. Bəlkə, onlar (pisəməllərdən) çəkinsinlər![36]

5. Yaxşılığı əmretmək və pisliklərdən çəkindirmək duanın qəbul səbəblərindəndir.

Huzeyfə bin Yəməndən (radiyallahu anhu) rəvayət edildiyinə görə Rasulullah (sallallahu aleyhi və səlləm) belə buyurmuşdur:

Nəfsim əlində olan Allaha and olsun ki, mütləq yaxşılığı əmr edəcək və pisliklərdən insanları çəkindirəcəksiniz. Belə etməzsəniz Allah sizə bir cəza

[36] Əraf surəsi, 164

göndərər, Ona dua edərsiniz duanız qəbul olunmaz.[37]

6. Yaxşılığı əmr etmək və pisliklərdən çəkindirmək günahlara kəffarədir.

Huzeyfə bin Yəmən nəqledirki: Mən Allah Rəsulunu belə deyərkən eşitdim: İnsanın əhli, malı, uşaqları və qonşusuna görə düçar olduğu fitnəyə, namaz, oruc, sədəqə, yaxşılığı əmr etmək və pisliklərdən çəkindirmək kəffarə olar.[38]

7. Yaxşılığı əmr etmək və pisliklərdən çəkindirmək böyük əcirlərin və mükafatın qazanılmasına səbəbdir. Allah (azzə və cəllə) buyurur:

Onların gizli söhbətlərinin çoxunda xeyir yoxdur. Sədəqə verməyi və ya

[37] Sünəni Tirmizi, 4/468

[38] Fəthul Bəri 2/8, Kitəbu Məvəqitis Saləh 252; Səhihi Muslim 1/128, Kitəbul İmən 144

yaxşılıq etməyi yaxud da insanlar arasında sülh yaratmağı əmr edən şəxsin (dəvəti) isə istisnadır. Kim bunu Allahın razılığını qazanmaq üçün edərsə, Biz ona böyük mükafat verərik.[39]

Yaxşılığı əmr etmək və pisliklərdən çəkindirmək İslam ümmətini dirildər, bidətlər isə həlak edər. Yaxşılığı əmr etmək və pisliklərdən çəkindirmək vacibi haqqı ilə yaşanarsa batil və həva əhli zəyifləyər. Bu mömininin ən açıq vəsflərindəndir, möminlər üçün ən böyük qüvvət toplama, güclənmə və sünnəyə sarılma vəsiləsidir. Bundan qəflət içində olmaq bu vəzifəni yerinə gətirmədə səhlənkar olmaq vəya onu tərk etmək çox böyük fəsadlar və zərərlər

[39] Nisə surəsi, 114

gətirər. Bu vəzifəni düzgün yerinə yetirmək isə çoxlu faydalar gətirər.

Yaxşılığı əmr etmək və pisliklərdən çəkindirmək ilə əlaqəli kitabların, məqalələrin çoxluğuna baxaraq mövzunun hər yönü ilə ələ alındığını düşünmək xətadır. Fikrimcə bu mövzunun əlavə çalışmalara ehtiyacı vardır. Xüsusəndə bu vəzifənin müqəddiməsi olan kitab və sünnədəki prinsiplər üzərinə alimlərin də bəyan etdiyi kimi bu vacibi etmə metodunun təməlləri və qaydaları mövzusunda əlavə araşdırmaya ehtiyac vardır. Çünki çox zaman bu vəzifəni etmək istəyən birisi yaxşılığı əmr etmək və pisliklərdən çəkindirməkdə istinad edindiyi və dəlil aldığı ən asan təməli bilməyə bilər ya da

bu mövzunun istinadını yaxud dəlilini anlamamış olabilər.

Bəzən dəvətçilərdən elmsiz bir şəkildə əmir və nəhy edən, dəlilsiz, istinadsız fətva verənlər olur. Bəzən isə dəvətçilər insanların etmiş olduqlarına baxmayaraq fəzilət və əxlaqi gözəlliklərə dəvət edirlər. Halbuki, insanların etmiş olduqları münkərlər əxlaqi bir nöqsan yaxud ədəbsizlik ilə əlaqəli bir məsələ deyildir. Məsələn, insanlar şirk və küfr etdikləri halda bunu görən dəvətçi bu mövzulara diqqət yetirməli və insanları bu xətalardan tövbəyə dəvət etməlidir. Əsas olan insanların xəta etdiklərini düzəldib sonra digər məsələlərə keçməkdir. İnsanların əqidələrini sarsan və batil edən inanclar varkən, əqidədə

olan bu boşluğu doldurub, şübhələri dəf etmədən əməli məsələlər( fəzilətlər) üzərinə yoğunlaşmaq düzgün deyildir. Əqidəsiz əməl olmaz, əməlsizdə əqidə olmaz. Bu ikisi bir-birinə bərabər düşünülməsi lazım olan məsələlərdir.

Bəzi dəvətçilərdə əhil olmadıqları halda münkəri əlləri ilə dəf etməyə çalışırlar. Bəzəndə yaxşılığı əmr edərkən və pisliklərdən çəkindirərkən sabit ola bilmirlər. Bəzən də səbr və dözümlülükləri az olduğu üçün dəvətin nəticəsində tələskən olurlar. Bu kimsələr Allah Rəsulunun (sallallahu aleyhi və səlləm) dəvətində, əmr etməsində, nəhy etməsində həyata keçirdiyi mənhəcə tabe olmayaraq İslami dəvətə, insanlara və həmçinin özlərinə pislik etmiş olurlar. Bu

səbəblə onların etdikləri islah səyləri, islahdan daha çox fəsada səbəb olur.

Burada Ömər bin Abdulazizin sözünü nəqletmək yerinə düşərdi:

Hər kim elmsiz olaraq Allaha ibadət edərsə, fəsadı islahından çox olar.[40] Allahdan sabitlik və müvəffəqiyyət diləyirəm.

[40] Cəmiu bəyəni-l ilm, 1/131